***Rəhmli, mərhəmətli Allahın adı ilə!***

## MÜQƏDDİMƏ

Həmd ancaq Allaha məxsusdur. Ona həmd edir, ancaq Ondan yardım və bağışlanma diləyirik. Nəfslərimizin şərindən və pis əməllərimizdən Ona sığınırıq. Allahın haqq yoluna yönəltdiyi kəsi heç kim azdıra bilməz, Onun azdırdığı kəsi isə heç kim haqq yoluna qaytara bilməz. Şəhadət verirəm ki, Allahdan başqa ibadətə layiq haqq məbud yoxdur, O təkdir və şəriki yoxdur. Şəhadət verirəm ki, Məhəmməd onun qulu və elçisidir.

Şübhəsiz ki, Allahın dinində möhkəm və səbatlı olmaq əzm və rəşadətlə doğru yolu getmək istəyən hər bir sadiq müsəlmanın əsas məqsədi olmalıdır.

**Mövzunun əhəmiyyətini tam dəqiqliyi ilə qavramaq üçün aşağıdakı məsələlərə nəzər salmaq lazımdır:**

! Müsəlmanların yaşadığı hazırkı cəmiyyətlərin vəziyyəti, od-alovundan iztirab çəkdikləri müxtəlif fitnə-fəsadlar və günahlar, dinin qəribə görünməsinə və bu dindən yapışanlar barədə: "Onun dinindən bərk-bərk yapışan, əlində qaynar kömürü bərk-bərk saxlayana bənzər" kimi qəribə bir misalın yaranmasına gətirib çıxaran müxtəlif şəhvət və şübhələr.

Ağlı və kamalı olan hər bir insan üçün şübhə doğurmur ki, bu günün müsəlmanları Allahın dinində möhkəm və səbatlı olmağa aparan yollardan əvvəlki müsəlmanlara nisbətən daha bərk yapışmalıdır. Çünki zəmanənin pisliyi, pozğunluğu, müsəlmanlar arasında birliyin və bir-birinə əl tutmağın azlıq təşkil etməsi, bir sözlə, bütün bunlar bizdən bu zərurətin həyata keçirilməsi üçün bütün lazımı səy və cəhdləri əsirgəməməyimizi tələb edir.

! Mürtədlik, islamı tərk edərək yenidən öz ata-babalarının puç dininə dönmə hadisələri çoxalmışdır. Belə halların xüsusilə, bəzi din xadimləri tərəfindən baş verməsi isə

müsəlmanları bu və ya digər aqibətlərdən çəkinməyə vadar etmiş və onlar nicata aparan yollar axtarmağa başlamışlar.

! Haqqında danışdığımız mövzu bilavasitə qəlblə bağlıdır və Peyğəmbər, ε, bu barədə hədislərinin birində belə buyurmuşdur: *«Adəm övladının qəlbi od üzərindən asılmış qaynar qazandan da tez çevriləndir»*.[1] Peyğəmbərimiz, ε, qəlblə bağlı başqa bir bənzətməni misal göstərərək belə demişdir: *«Qəlbin bu cür adlandırılması onun dəyişkənliyindən və səbatsızlığından irəli gəlir. Həqiqətən, qəlb küləyin havada altını üstünə, üstünü də altına çevirdiyi ağac gövdəsindən sallanmış lələyə bənzər»*.[2] Ürəkdən söz düşmüşkən şairin bu barədə dediyi beyti qeyd etsək, lap yerinə düşərdi:

وما سُمي الإنسانُ إلا لنسيه

ولا القلبُ إلا أنه يتقلب

*Tərcüməsi:* insan yalnız unutqan olduğu üçün ona bu ad verilmişdir, qəlb isə məhz dəyişkən olmasından bu cür adlandırılmışdır.

Bu tez dəyişən əzanın şəhvət və şübhələrin gücü ilə möhkəmləndirilməsi çox təhlükəli bir metoddur. Vəzifənin böyüklüyünə və çətinliyinə müvafiq böyük vəsaitlərə ehtiyac vardır.

## SƏBATIN YOLLARI

Uca və böyük Allahın müqəddəs kitabında Peyğəmbərinin,(sav), dili və onun rəngarəng həyatı vasitəsilə səbatın bir çox yollarını bizə açıqlaması təbii ki, Onun bizə olan rəhm və mərhəmətinin bariz nümunəsidir. Əziz oxucu, aşağıda bu yollardan bəzilərinin qısaca icmalını vermək istəyirəm.

---

[1] Hədisi Əhməd və Hakim rəvayət etmişdir.
[2] Hədisi Əhməd rəvayət etmişdir.

**1. Qurana müraciət etmək.**

Müqəddəs Quran dində səbatlı olmağın ən ilkin metodudur. O, Allahın möhkəm ipi və aydın bir nurudur. Kim ondan bərk-bərk yapışsa, Allah-taala onu qoruyar, kim onu əlində rəhbər tutsa, Allah-taala onu xilas edər və kim də insanları onun buyurduğu əmr və qadağalara riayət etməyə çağırsa, Allah-taala onu doğru yola yönəldər.

Allah-taala bu müqəddəs kitabın tədricən və müfəssəl şəkildə nazil olunmasında məqsədin məhz səbat olmasını işarə etmiş və Öz kitabında kafirlərin şəkk-şübhələrinə cavab verərək belə demişdir: **«Kafirlər: "Quran ona [Məhəmmədə] bütöv [birdəfəlik] endirilməli idi!" – dedilər. [Ya Məhəmməd!] Sənin ürəyinə səbat [qətiyyət] vermək üçün Biz onu ayə-ayə [tədriclə] nazil etdik. [Ya Məhəmməd! Müşriklər] sənin yanına gəlib elə bir misal çəkməzlər ki, Biz sənə onun doğru cavabını [verməyək] və [onların gətirdikləri misallardan] izahatca daha yaxşısını gətirməyək».** (əl-Furqan, 32-33).

**NƏ ÜÇÜN QURANİ-KƏRİM SƏBATIN BÜNÖVRƏSİDİR?**

! Çünki o, qəlbə iman toxumları səpir, qəlbi Allaha bağlayaraq onu [qara ləkələrdən və çirkin niyyətlərdən] təmizləyir.

! Çünki quran ayələri möminin qəlbinə elə sərin və zərərsiz halda nazil olur ki, fitnələrin qasırğası belə, qəlbə yaxın gələ bilmir və o, Allahın zikri ilə öz rahatlığını tapır.

! Çünki o, müsəlmanı sayəsində yaşadığı cəmiyyəti qiymətləndirmək (islah etmək) iqtidarına malik olduğu idrak hissi və əxlaqi dəyərlərlə, hər bir şərait və hadisəyə müvafiq qərəzsiz hökmlər müəyyənləşdirən bir çox ölçülərlə təmin edir.

! Belə ki, Qurani-Kərim ilkin islam dövrünün yaşadığı canlı şübhələr kimi islamın düşmənləri olan kafir və münafiqlərin gətirdikləri bütün şəkk-şübhələri rədd edir. Buna aşağıdakı nümunələri göstərmək olar:

Müşriklər: «Məhəmməd Allah tərəfindən tərk olundu» – dediyi zaman uca və böyük Allahın nazil etdiyi bu ayənin: **«[Sənə bir neçə gün vəhy nazil etməməklə] Rəbbin səni [ya Peyğəmbər!] nə tərk etdi, nə də sənə acığı tutdu»** (əd-Duha, 3) Allahın elçisinə təsiri nədən ibarət idi?

Qüreyş kafirləri Məhəmmədi, (sav), öyrədənin insan olmasını və onun Quranı Məkkədəki bizanslı bir dülgərdən öyrənməsini iddia etdikləri zaman uca və böyük Allahın nazil etdiyi bu ayənin: **«Biz [müşriklərin]: "[Quranı Məhəmmədə] bir insan [ara-sıra görüb danışdığı Cəbr ər-Rumi adlı xaçpərəst bir gənc və ya Səlman əl-Farsi] öyrədir!" – dediklərini də bilirik. Onların nəzərdə tutduqları adamın dili başqa dildir. Bu [Quranın dili] isə açıq-aşkar [bəlağətli, fəsahətli] ərəb dilidir!»** (ən-Nəhl, 103) təsiri nə oldu?

Münafiqlərdən biri: «Mənə döyüşə getməməyə izn ver, məni fitnəyə salma!» – dediyi zaman uca və böyük Allahın nazil etdiyi bu ayənin: **«Bilin ki, onlar [özləri] fitnəyə düşmüşlər. Şübhəsiz ki, Cəhənnəm kafirləri bürüyəcəkdir!»** (ət-Tovbə, 49) möminlərə təsiri nədən ibarət idi?

Məgər bütün bunlar səbata aparan yol, inanan qəlblərlə bir bağlantı, şübhələrə cavab və böhtançıların susdurulması deyilmi? And olsun Allaha ki, elədir.

Təəccüblüdür ki, Allah-taala Hüdeybiyyə sülhündən qayıdarkən möminlərə çoxlu qənimət götürəcəklərini vəd etmişdir. (Burada Xeybər döyüşündə əldə olunan qənimətlər nəzərdə tutulur) Allah-taala qəniməti götürməyi möminlər üçün tezləşdirəcək və onlar qəniməti əldə etmək üçün yalnız özləri gedəcəklər. Bu zaman münafiqlər müsəlmanlarla birgə getməyi tələb edəcək. Müsəlmanlar onlara: «Siz bizimlə gəlməyəcəksiniz!» – deyəcəklər. Münafiqlər Allahın kəlamını dəyişdirmək barədə öz niyyətlərini həyata keçirmək üçün israr edəcək və möminlərə: «Xeyr, siz bizə paxıllıq edirsiniz» – deyəcəklər. Allah-taala bütün bunlara Öz kitabında belə cavab

verir: **«Harada olursunuz olun, hətta uca [möhkəm] qalalar içərisində olsanız belə, ölüm sizi haqlayacaq. [Ya Məhəmməd! ] Onlara [yəhudilərə və münafiqlərə] bir xeyir yetişdikdə: "Bu, Allahdandır!" – deyərlər, bir pislik üz verdikdə isə: "Bu səndəndir!" – söyləyərlər. [Onlara] de: "Hamısı Allah tərəfindəndir". Bu camaata nə olub ki, az qala söz də anlamır!»** (ən-Nisa, 78). Sonra bütün bunlar möminlər qarşısında mərhələ-mərhələ, addımbaaddım, sözbəsöz baş verir.

Buradan həyatlarını Quranın əmr və qadağalarına uyğun şəkildə tənzimləyən, onu oxuyaraq, əzbərləyərək, tam mənasını anlamağa çalışaraq, barəsində düşünərək ona müraciət edən və ona qayıdan insanlarla bəşər kəlamını əllərində rəhbər tutan və onu həyatlarının ən başlıca qayğısına çevirən insanlar arasındakı açıq-aydın fərqi görə bilərik.

Çox yaxşı olardı ki, elm tələbələri öz məqsədlərinə nail olmaq üçün Qurani-Kərim və onun təfsirinə geniş yer versinlər.

**2. Allah-taalanın təyin etdiyi qayda-qanunonları rəhbər tutmaq və saleh əməl.**

Bu barədə Allah-taala Öz kitabında buyurur: **«Allah iman gətirənləri dünyada da, axirətdə də möhkəm bir sözlə [kəlmeyi-şəhadətlə] sabitqədəm edər. Allah zalimləri [haqq yoldan] sapdırar. Allah istədiyini edər!»** (İbrahim, 27).

Qətadə demişdir: «Allah-taala mömin bəndələrini bu dünyada xeyirlə, [axirətdə] qəbrdə isə saleh əməllə sabitqədəm edər». Bu barədə bir çox sələflərdən rəvayətlər vardır. Allah-taala yenə bu barədə Öz kitabında buyurur: **«Əgər Biz onlara: "Özünüzü öldürün, yaxud yurdlarınızdan çıxın!" – deyə yazıb əmr etsəydik, içərilərindən az bir hissəsi müstəsna olmaqla, [bu əmri] yerinə yetirməzdilər. Əgər onlar verilən nəsihətlərə əməl etsəydilər, əlbəttə, bu onlar üçün daha xeyirli və daha düzgün olardı. [İmanda**

**sabitqədəmlik baxımından daha möhkəm bir addım olardı]».** (ən-Nisa, 66).

Buna baxmayaraq, yaxşı əməllərin başında fitnə (çətinlik) görünərsə və bu əməlləri tərk etmiş tənbəllərə bir bədbəxtçilik üz verərsə, onlardan dində səbatlı olmalarını gözləmək olarmı?! Lakin iman gətirib saleh əməllər edənləri Allah-taala öz imanları ilə doğru yola yönəldər. Buna görə də Peyğəmbər, ε, yaxşı əməl sahibi olmağa cəhd göstərərdi. Onun üçün ən sevimli iş az da [kiçik bir iş də] olsa, davamlı olanıdır. Onun səhabələri, o cümlədən Aişə bir iş görərkən onu tam və lazımi səviyyədə başa çatdırardı. Bu barədə Peyğəmbər, (sav), hədislərinin birində belə deyir: *«Kim on iki rükət nafilə namazının qılınmasına riayət etsə, onun Cənnətə daxil olması vacib olar».*[1] Digər bir qüdsi hədisdə isə Allah-taala belə buyurur: *«Qulum Mən onu sevənədək nafilə namazlarla Mənə yaxınlaşmaqda davam edir».*[2]

**3. Peyğəmbərlərin hekayətləri barədə düşünmək və onların örnək və təqlid üçün öyrənilməsi.**

Gəlin Allah-taalanın bu barədə nazil etdiyi ayəyə nəzər salaq: **«[Ya Məhəmməd!] Biz peyğəmbərlərin xəbərlərindən [başlarına gələnlərdən] ürəyini möhkəmləndirəcək [qəlbinə qüvvət verəcək] nə varsa, [hamısını] sənə nağıl edirik. Bu [surə] sənə haqq, möminlərə isə moizə və öyüd-nəsihət olaraq gəlmişdir!».** (Hud, 120).

Bu ayələr Allah elçisinin zamanında əyləncə məqsədilə deyil, onun və onunla birgə olan möminlərin qəlblərinə səbat və qətiyyətin verilməsi kimi böyük bir məqsədlə nazil olmuşdur.

Əziz qardaşım, yaxşı olardı ki, uca və böyük Allahın bu kəlamı barədə ətraflı düşünəsən: **«[Nəmrud və ətrafındakılar öz camaatına] belə dedilər: "Əgər [tapındıqlarınıza yardım göstərmək, onları xilas etmək üçün] bir iş görəcəksinizsə,**

---

[1] Hədisi Tirmizi və Nəsai rəvayət etmiş, Tirmizi isə onu həm yaxşı, həm də səhih adlandırmışdır.
[2] Hədisi Buxari rəvayət etmişdir.

**onu [İbrahimi] yandırın və tanrılarınıza kömək edin!” Biz də: “Ey atəş! İbrahimə qarşı sərin və zərərsiz ol! [Hətta soyuğun belə ona zərər yetirməsin! ]” – deyə buyurduq. Onlar [İbrahimə] hiylə qurmaq istədilər, lakin Biz onları [cürbəcür müsibətlərə düçar etməklə, xüsusilə üstlərinə ətlərini yeyib qanlarını içən həşərat göndərməklə] daha çox ziyana uğratdıq».** (əl-Ənbiya, 68-70). İbn Abbas isə belə demişdir: «İbrahimin oda atılarkən son sözü: “Allah bizə bəs edər. O nə gözəl vəkildir” – olmuşdur».

Məgər bu hekayət barədə ətraflı düşünərkən əzab və zülm qarşısında səbatın əhəmiyyətinin nədən ibarət olmasını duymursanmı?

Əziz qardaşım, yaxşı olardı ki, uca və böyük Allahın bu kəlamına diqqət yetirəsən: **«İki dəstə [tayfa] bir-biri ilə qarşılaşdığı zaman Musanın camaatı dedi: “[İşimiz bitdi!] Artıq yaxalandıq!” [Musa] dedi: “Xeyr, Rəbbim mənimlədir. O, mütləq mənə yol göstərəcəkdir!”».** [əş-Şuəra, 61-62].

Məgər sən bu hekayətə diqqət yetirərkən zalimlərlə qarşı-qarşıya gəldikdə və çətin anlarda Allahdan ümidini kəsmiş insanların fəryad qopardığı zaman səbatın nələrə qadir olduğunu hiss etmirsənmi?

Əziz oxucu, yaxşı olardı ki, Fironun sehrbazları haqqında hekayətə də nəzər salasan. Bu qəribə hekayət həqiqətin açıq-aydın üzə çıxmasından sonra haqq üzərində sabitqədəm olan bir dəstə sehrbazdan bəhs edir.

Məgər sən zalımın təhdidləri qarşısında qəlbi sabitqədəm edən səbatın böyük əhəmiyyətini görmədinmi? Allah-taala bu barədə aşağıdakı ayədə xəbər verir: **«[Firon] dedi: “Mən sizə izn verməmişdən əvvəl siz ona iman gətirdiniz, çünki o, həqiqətdə sizə sehr öyrədən böyüyünüzdür. [Heç eybi yoxdur]. Mən də sizin əl-ayağınızı çarpaz kəsdirib xurma ağaclarının kötüklərindən asacağam. Onda hansımızın [mən Fironun, yoxsa Musanın Allahının] əzabının daha şiddətli və daha sürəkli olduğunu biləcəksiniz!”».** (Taha,

71). Sehrbazlar isə azlıq təşkil etmələrinə baxmayaraq, sabitqədəmlik baxımından bir qarış da olsun geri çəkilmədən Fironun təhdidlərini belə cavablandırdılar: **«Biz heç vaxt səni bizə gələn bu açıq möcüzələrdən və bizi yaradandan üstün tutmayacağıq. İndi nə hökm edəcəksənsə, et. Sən ancaq bu dünyada hökm edə bilərsən!».** (Taha, 72).

Bu mövzu ilə əlaqədar «Yasin» surəsində haqqında danışılan mömin bəndənin hekayəti, Firon ailəsindən olan bir mömin kişinin hekayəti, xəndək sahibləri və digər hekayətlər barəsində də danışmaq olar. Lakin bütün bu hekayətlərdən ən çox örnək götürüləsi məqam Allahın dininə olan sədaqət və bu dində olan sabitqədəmlikdir.

**4. Dua.**

Allahın mömin bəndələrinin sifətlərindən biri də onların Allah-taalanın onları dində sabitqədəm etməsi üçün Ona dualarla yönəlmələridir.

Ey Rəbbimiz! Bizi doğru yola yönəltdikdən sonra ürəklərimizə şəkk-şübhə [azğınlıq, əyrilik] salma!

Ey Rəbbimiz! Bizə bolluca səbr və dizimizə qüvvət ver!

Peyğəmbər, ε, qəlb barəsində hədislərinin birində belə buyurur: *«Adəm övladlarının qəlbləri bir qəlb kimi Rəhmanın iki barmağı arasındadır, onu istədiyi kimi döndərir».*[1] Bu baxımdan da Allahın elçisi tez-tez Allaha belə müraciət edərdi: *«Ey qəlbləri döndərən! Mənim qəlbimi Öz dinində səbatlı (sabitqədəm) et!»*[2]

**5. Allahı yada salmaq.**

Allahı zikr etmək səbatın ən başlıca amillərindəndir. Əziz oxucu istərdim ki, diqqətini aşağıdakı ayədə iki amil arasındakı bu bağlılığa yönəldəsən. Beləliklə, uca və böyük Allah buyurur: **«Ey iman gətirənlər! Bir dəstə [kafir dəstəsi] ilə üz-üzə gəldikdə möhkəm olun və Allahı çox yada salın ki, bəlkə, nicat tapasınız!»** (əl-Ənfal, 45). Ayədən də göründüyü kimi

---

[1] Hədisi Əhməd və Müslim İbn Ömərdən *mərfu* isnadla rəvayət etmişdir.
[2] Hədisi Tirmizi Ənəsdən *mərfu* isnadla rəvayət etmişdir.

Allah-taala cihad zamanı düşmənlə üz-üzə gələrkən daha da səbatlı olmaq üçün Onu yada salmağı ən əsas vasitələrdən biri etmişdir.

Farsların (sasanilərin) və bizanslıların vücudlarına nəzər sal. Onlara daha çox ehtiyac duyduqları [güvəndikləri] halda və Allahı çox yada salanların azlıq təşkil etməsinə baxmayaraq, onların ümidlərini necə də puç etdi.

Yusif, (aleyhissələm), mənsəb sahibi, gözəl olan və onu özü ilə yatmağa dəvət edən qadının fitnəsi qarşısında əyilməmək üçün hansı vasitə ilə Allahdan yardım istədi? Məgər o, Allahın pənahgah qalasına sığınmadımı və şəhvət qoşunlarının kükrəyən dalğaları bu qalanın divarları önündə param-parça olmadımı?

Bəli, möminlərin səbatlı və mətanətli olmasında Allahı yadasalmanın rolu bundan ibarətdir.

**6. Müsəlmanın doğru yolun yolçusu olmağa can atması.**

Hər bir müsəlmana yolçusu olması vacib olan yeganə doğru yol varsa, o da Peyğəmbərin, ε, yoludur. Bu yol müzəffər cəmiyyətin, nicat tapmış firqənin, saf əqidə və sağlam metod əhlinin, Peyğəmbər, ε, yolunun davamçılarının, o cümlədən Quran və Sünnəni əllərində rəhbər tutanların yoludur. Ancaq bu yolla Allah düşmənlərindən fərqlənmək və zəlalət əhlindən ayrılmaq olar.

Əgər sən bunun mətanətli olmaqda rolunun nədən ibarət olmasını bilmək istəyirsənsə, onda özündən soruş: nə üçün bir çox keçmiş və indiki xalqlar zəlalətə uğradılar, səbatsızlığa düşdülər, doğru yolda sabitqədəm ola bilmədilər və məhz bu yolun yolçuları kimi haqq dərgahına qovuşa bilmədilər? Yaxud nə üçün bu yola ömürlərinin çox hissəsi ötüb keçdikdən və həyatlarının ən dəyərli çağlarını itirdikdən sonra çatdılar?

Çünki onların bəziləri mötəzilik, təhrif (Allahın ad və sifətlərinin yozulması), qədəriyyəlilik, mürciəlilik və digər yollara düşərək bidət etdilər və zəlalətə uğradılar.

Bidət əhli bu yolla səbatsızlığa uğradı.

Lakin fikirləş, düşün! Peyğəmbərin сцннəsinə əməl едənlərdən heç olmasa birinin bu yolu tanıdıqdan, dərk etdikdən və onun yolçusu olduqdan sonra hiddətlənərək bu yoldan geri döndüyünü gördünmü? Ola bilsin ki, o bu yolu bəzi ehtiraslara, şəhvətlərə, yaxud da onun zəif düşüncəsinin məruz qaldığı bəzi şübhələrə görə tərk etsin. Lakin elə bir adam tapılmaz ki, o bu yoldan daha doğru olanını gördükdən və ya bu yolun əsassız olması ona məlum olduqdan sonra onu tərk etsin.

Buna sübut olaraq gəlin Bizans hökmdarı İrakli Əbu Süfyanla Məhəmməd peyğəmbərin, ε, məsləkdaşları barəsindəki olan söhbətinə nəzər salaq. Beləliklə, o İrakli Əbu Süfyandan soruşur: «Onların heç olmasa biri bu dini qəbul etdikdən sonra ona hiddətlənərək bu dindən döndümü?» Əbu Süfyan: «Xeyr!» – deyə cavab verir. Sonra İrakli deyir: «İman da belədir, onun təbəssümü ürəkləri bir-birinə bağlayır».[1]

Bidət içində olan insaların Allahın hidayətindən sonra öz əsassız yollarına hiddətlənərək onu tərk edib Peyğəmbərin сцннəsinə qayıdanlar barəsində çox eşitmişik. Lakin bunun əksini necə, eşitmişikmi?!

Əgər sən də Allahın dininə sədaqət göstərmək və bu dində səbatlı olmağı istəyirsənsə, onda mütləq möminlərin getdiyi yolun davamçısı olmalısan.

**7. Tərbiyə.**

Dini, elmi, şüuri və tədriclə tərbiyə səbatın ən əsas amillərindəndir.

**Dini tərbiyə.** Bu tərbiyə metodu ürəyə və vicdana qorxu, ümid və məhəbbət bəxş edərək onu daha da canlandırır. Qurani-Kərim və Peyğəmbərin, ε, hədisləri kimi müqəddəs mətnlərdən uzaq düşmənin nəticəsində meydana gəlmiş cansıxıcılığı və insanların cəfəngiyatlarına aludə olmağı qəti şəkildə rədd edir.

---

[1] Hədisi Buxari rəvayət etmişdir.

**Elmi tərbiyə.** Bu metod isə əsaslı dəlillərə istinad edir, təqlid etməni və savadsızlığı rədd edir.

**Şüuri tərbiyə.** Bu metod cinayətkarların [günahkarların] yolunu tanımır, islam düşmənlərinin taktikalarını öyrənir, elmi faktlar barədə xəbər verir, hadisələrin mahiyyətini tam qavrayaraq düzgün təhlil edir, müvəqqəti kiçik vəziyyətlərə qapanıb qalmağı rədd edir.

**Tədriclə tərbiyə.** Müsəlmanı asta-asta, onu əsaslı ölçülərlə kamilliyinə aparan yollarda daha da dirçəldir. Eyni zamanda düşünülməmiş hərəkət etməyi, tələskənliyi və dağıdıcı sıçrayışları qəti şəkildə rədd edir.

Səbatın ünsürlərindən olan bu ünsürün əhəmiyyətini dərk etməyimiz üçün Allah elçisinin həyatının bəzi səhifələrini vərəqləyək və özümüzə bəzi suallarla müraciət edək.

*Məkkədə müsəlmanların təqiblərə və zülmlərə məruz qaldıqları zaman Peyğəmbərin, ε, səhabələrinin dində səbatlı olmaları nədən irəli gəlirdi?

*Bilal, Xəbbab, Məsab, Yasirin ailəsi kimi zəif müsəlmanlar, habelə böyük səhabələr xalqın mühasirəsində necə möhkəm ola bildilər?

*Onların peyğəmbərlik məktəbindən dərin tərbiyə almadan səbatlı olmaları və bu məktəbi keçmədən onların şəxsiyyətlərin formalaşması mümkündürmü?

Gəlin Xəbbab ibn əl-Ərat adlı bir səhabənin başına gələnlərə qısaca nəzər salaq. Onun ağası dəmir şişləri qıpqırmızı olanadək qızdırdıqdan sonra onu çılpaq kürəyi üstə həmin şişlərin üstünə atır. Şişlər ancaq Xəbbabın kürəyinin piyi əriyib onların üzərinə axdığı zaman soyumağa başlayır. Bəs Xəbbabı bütün bunlara dözməyə vadar edən nə idi?

Yaxud da havanın bərk isti olduğu vaxt Bilalın qarnına qaya parçasının qoyulmasını, Sümeyyənin əl-qolunun dəmir xalta və zəncirlərlə bağlanaraq zülmə məruz qalmasını yada salaq.

Mədinə dövründə yaranan digər bir şəraitə nəzər salarkən belə bir sual ortaya çıxır. Müsəlmanların əksəriyyəti

məğlubiyyətə uğrayarkən Hüneynədə Peyğəmbərlə, ε, birgə sonunadək mərd dayanan kimlər idi? Onlar peyğəmbərlik məktəbində lazımi tərbiyəni almayan islamı təzəcə qəbul edənlər və Məkkənin fəthi sayəsində müsəlman olanlar idimi? Yoxsa əksəriyyəti yalnız qənimət məqsədilə oraya getmişdi? Əsla! Onlar Allah elçisindən yüksək tərbiyə almış və Allah-taala tərəfindən seçilmiş mömin qəlbli insanlar idi.

Əgər onlar haqqında danışdığımız belə bir tərbiyənin sahibi olmasaydılar, sabitqədəm ola bilərdilərmi?

**8. Yola inam.** Şübhə yoxdur ki, müsəlmanın yolçusu olduğu yola inamı artdıqca bu yolda daha da səbatlı olmalıdır. Bunun da aşağıda sadalayacağımız bir neçə yolları var:

! Əziz qardaşım! Sənin getdiyin bu doğru yolun yeni, yaşadığın zəmanədə yaranmış olduğunu deyil, səndən öncə peyğəmbərlərin, siddiqlərin (özündə-sözündə doğru olanlar) şəhidlərin və əməlisaleh insanların getdiyi qədim bir yol olduğunu duymağın zəruridir. O zaman qəribçilik hissi səni tərk edəcək, tənhalığın ünsiyyət və mehribançılıqla, kədərin sevinc və şadlıqla əvəz olunacaq. Çünki sən artıq onların hamısının bu yolda sənə qardaş olduğunu hiss edəcəksən.

! Bu yolun yolçusu olan hər bir kəs Allahın seçilmiş bəndəsi olduğunu hiss etməli və buna layiq olmağa çalışmalıdır. Uca və böyük Allah da Öz müqəddəs kitabında bu məsələni xüsusi şəkildə vurğulayır:

**«[Ya Məhəmməd!] De: “Həmd olsun Allaha! Salam olsun [Allahın peyğəmbər] seçdiyi bəndələrinə!...».** (ən-Nəml, 59).

**«Sonra Kitabı bəndələrimizdən seçdiklərimizə [Məhəmməd ümmətinə] miras verdik...».** (Fatir, 32).

**«[Yuxuda gördüyün kimi] Rəbbin səni [başqalarından] seçib üstün tutacaq...».** (Yusif, 6).

Belə ki, Allah-taala peyğəmbərləri Öz qulları arasından seçmiş və bu seçimdən saleh bəndələrinə də pay ayırmışdır. Bu pay peyğəmbərlərin özlərindən sonra qoyub getdikləri elmin varisi olmaqdır.

Əgər Allah-taala səni cansız bir cisim, heyvan, bidətin təbliğatçısı, fasiq, islamın təbliğindən uzaq olan bir müsəlman, yaxud da insanları xətalarla dolu olan bir yola yönəldən insan kimi xəlq etsəydi, onda sənin hiss etməyin necə olardı?

Məgər Allah-taalanın səni digər qulları arasından seçməyini hiss etmirsənmi? Səni getdiyin yolda səbatlı olmağın üçün əsas amillərdən biri olan иclamın təbliğatçısı etməyini görmürsənmi?

**9. Uca və böyük Allaha çağırışın həyata keçirilməsi.**

İnsan bədəni hərəkət etməsə, pas atar, açıqda olmasa, çürüyər. Qəlb rahatlığının ən əzəmətli yollarından biri də Allaha çağırışdır. Bu yol elçilərin vəzifəsi olub insanları da əzabdan xilas edib. Burada güc-qüdrət get-gedə artır, vəzifələr həyata keçirilir. Buna görə də Allahın əmrinə müvafiq olaraq, insanları Onun yoluna çağır və doğru yola yönəl. Bu barədə deyilən söz: «Filankəs nə qabağa düşdü, nə də geri qaldı» heç də yerində işlədilən bir ifadə deyil. Əgər sən nəfsini Allaha itaət etməyə vadar edə bilməsən, o səni Allaha asi olmağa sövq edəcək. İman isə həm artır, həm də azalır.

Doğru yola çağırış vaxt sərf etməklə, ağılla, canfəşanlıqla və gözəl danışıqla həyata keçirilməlidir. Belə ki, dəvət müsəlmanın məqsədi və ən başlıca qayğısı olmalıdır ki, şeytanın yalançı səy və fitnələrinin qarşısını ala bilsin.

Maneə törədənlərə, inadkarlara və batil fikirdə olanlara qarşı mübarizə aparmaqla təbliğatçının daxilində baş verən duyğu və hissləri də buna əlavə etmək olar. Belə ki, o öz missiyasını yerinə yetirməklə imanı artar və etiqadı daha da möhkəmlənər.

Allahın haqq dini barədə təbliğat böyük savab olmaqla yanaşı həm də səbatın yollarındandır. Belə ki, bu təbliğat insanın dinindən dönməsinə mane olan bir amildir. Çünki təbliğatçı daim hücumdadır, onun müdafiəyə ehtiyacı yoxdur. Allah-taala da təbliğatçılarladır, onları sabitqədəm edər və xətalarını düzəldər. Təbliğatçı öz təcrübəsi və biliyi sayəsində xəstəliklərə qarşı mübarizə aparan həkimə bənzər və

başqalarında buna qalib gəlməklə özünü bu xəstəliklərdən qorumuş olur.

**10. Tarixi şəxsiyyətlərin həyatlarına müraciət etmək və onlardan örnək almaq.**

Bu şəxsiyyətləri Peyğəmbər, ε, öz hədisində belə vəsf edir: *«İnsanlar arasında elələri vardır ki, onlar xeyirin açarı, şərin isə qıfılıdırlar. Elələri də vardır ki, şərin açarı, xeyirin qıfılıdırlar. Allah-taalanın xeyrin açarlarını bəxş etdiyi insan necə də xoşbəxtdir. Vay olsun o kəslərə ki, Allah-taala şərin açarlarını ona nəsib edib!».*[1]

Alimləri, salehləri və mömin təbliğatçıları axtarıb tapmaq, onların əhatəsində olmaq səbatı daha da möhkəmləndirən amillərdir. İslam tarixində bir çox fitnələr baş vermiş və bu fitnələrdə Allah-taala müsəlmanları bir çox tarixi şəxsiyyətlərlə sabitqədəm etmişdir. Bu barədə mərhum Əli ibn əl-Mədini belə demişdir: «Allah-taala dini Riddə [mürtədlik] günü əs-Siddiqlə [Əbu Bəkrlə], Mihnə[1] günü isə Əhməd ibn Hənbəllə izzətləndirmişdir».[2]

İbn əl-Qəyyimin müəllimi şeyxülislam İbn Teymiyyənin səbatda rolu barəsində dediklərinə diqqət yetir! Yazır: «Qorxu bizi bürüdükdə, öz barəmizdə pis fikrə düşdükdə və özümüzə yer tapa bilmədikdə onun hüzuruna gələrdik. Bütün bu şübhələrdən və narahatçılıqlardan xilas olmağımız üçün onu görməyimiz və onun söhbətini dinləməyimiz kifayət edərdi».

Qullarına Qiyamət günündən öncə bu dünyada Öz Cənnətini göstərən, onun qapılarını bu dünyada onların üzünə açan, onun iyindən və mehindən onlara bəxş edən Allah bütün nöqsanlardan tənzih olunmuşdur. Belə ki, bu qullar hər bir ehtiyaclarından imtina edib yalnız onu tələb edər və yalnız onun uğrunda yarışa durarlar.

---

[1] Hədisi İbn Macə Ənəsdən *mərfu* isnadla rəvayət etmişdir. Hədis yaxşıdır.

[1] İmam Əhmədin dövründə mötəzilələrin Qurani-Kərimin məxluq olmasını iddia etməsi və xalqı bunu qəbul etməyə təhrik etməsi.

[2] "Siyəru ə'ləm ən-nubələi" cild 11/ səh. 196.

Buradan da belə məlum olur ki, islam qardaşlığı səbat üçün ən əsas başlanğıcdır. Sənin saleh, nümunəvi və ədəbli qardaşların bu yolda sənə dəstək və sənin söykəndiyin möhkəm bir dirəkdir. Onların dalınca get və onların himayəsində yaşa. Tənhalıqdan uzaq ol, çünki şeytanlar tənhalıqdan istifadə edib dərhal səni qamarlaya bilər. Unutma ki, qurd sürüdən aralı düşmüş qoyunu parçalar.

**11. Allahın köməyinə və gələcəyin islamın olmasına tam qətiyyətlə inanmaq.**

Allahın köməyi gecikərkən qədəmlərimiz möhkəmləndikdən sonra onların bir daha büdrəməməsi üçün səbata çox ehtiyacımız olur. Allah-taala bu barədə Öz kitabında buyurmuşdur: **«Neçə-neçə peyğəmbər bir yığın allahpərəstlə birlikdə [düşmənə qarşı] vuruşmuşlar. Lakin onlar Allah yolunda çəkdikləri müsibətlərə görə nə zəiflik, nə acizlik göstərmiş, nə də [kafirlərə] boyun əymişlər. Allah səbr edənləri sevər! Onların: "Ya Rəbbimiz, günahlarımıza və işlərimizdə həddi aşdığımıza görə bizi bağışla! Qədəmlərimizi möhkəmləndir [düşmən ilə vuruşda dizimizə qüvvət ver] və kafirlərə qələbə çalmaqda bizə kömək et!" – deməkdən başqa sözləri olmamışdı. Nəhayət, Allah onlara həm dünya nemətlərini, həm də ən gözəl axirət nemətini [Cənnəti] verdi. Allah yaxşı iş görənləri sevər!».** (Ali-İmran, 146-148).

Allahın elçisi müsəlmanların iztirablara və imtahanlara məruz qaldıqları günlər onları dözümlü olmağa çağırdıqda gələcəyin islamın olacağını bildirərdi.

Buxarinin Xəbbabdan *mərfu* isnadla rəvayət etdiyi hədisdə də bu məsələ öz əksini tapmışdır. Belə ki, hədisdə deyilir: «Allah elçisinin hüzuruna şikayətə gələrkən o, Kəbənin kölgəsində burdəsini [əbasını] yastıq kimi başının altına qoymuşdu. Dedik: "Ey Allahın elçisi! Bəs bizim üçün yardım diləmirsənmi, bizim üçün dua etmirsənmi?" Peyğəmbər, ε, dedi: *"Vaxt var idi sizdən əvvəlki ümmətlərdə adamı tutub*

*aparar, onun üçün quyu qazar və onu quyuya salardılar. Sonra mişar gətirib adamın başını iki hissəyə bölər, ətsiz və sümüksüz başı dəmir daraqla darayardılar. Lakin bütün bu əzablar belə, onun dinindən dönməsinə heç bir təsir göstərə bilməzdi. And olsun Allaha ki, bu günlər də gəlib keçəcək və elə bir vaxt gələcək ki, Səna ilə Həzrəmövt arasında gəzib dolaşan [sürüsünü otaran çoban] Allahdan və sürüsünə hücum çəkən canavardan başqa heç nədən qorxmayacaq. Lakin siz tələsirsiniz [səbirsizlik göstərirsiniz]"».*[3]

Gələcəyin islamın olmasını müjdələyən hədislərə nəzər saldıqda, belə məlum olur ki, yeniyetmələrin tərbiyəsində onların səbatlı olmaları ön plana çəkilməlidir.

**12. Batilin mahiyyətini öyrənmək və ona əsla aldanmamaq.**

Uca və böyük Allah bu barədə Qurani-Kərimdə buyurur: **«[Ya Məhəmməd!] Küfr edənlərin diyar-diyar gəzib dolaşması [ticarətdən, əkinçilikdən mənfəət əldə edərək xoş güzəran keçirməsi] səni aldatmasın!»** (Ali-İmran, 196). Bu ayə möminlərə təsəlli, kafirlərin tutduqları əməllərin isə bir daha təsdiqidir.

Uca və böyük Allah buyurur: **«Allah göydən bir yağmur endirdi, vadilər öz tutumlarına görə onunla dolub daşdı. [Sudan əmələ gələn] sel, üstünə çıxan bir köpüyü alıb apardı. [Haqq din olan islam insanlara, torpağa həyat verən suya, müşriklərin etiqadı isə boş köpüyə bənzər]. Bəzək şeyləri və ya əşya [qab-qacaq] düzəltmək məqsədilə insanların od üzərində qızdırıb əritdikləri [qızıl, gümüş və s. filizlərin] üstündə də buna bənzər bir köpük vardır. Allah haqq ilə batili [sizdən ötrü] ayırd etmək üçün belə misallar çəkir. Köpük heç bir şey olmadığı üçün uçub gedər. İnsanlara fayda verən bir şey isə yer üzündə qalar. Allah belə misallar çəkir!»** (ər-Rəd, 17). Bu ayədə ağıl

[3] Hədisi Buxari rəvayət etmişdir.

sahibləri üçün batildən qorxmamaq və ona təslim olmamaq barəsində bir ibrət vardır.

Allaha-taala buyurur: **«Biz ayələrimizi belə müfəssəl izah edirik ki, günahkarların yolu açıq-aydın bilinsin».** (əl-Ənam, 55). Yuxarıda qeyd etdiyimiz ayədən də göründüyü kimi Qurani-Kərim batil əhli ifşa edir, onların məqsədlərini və yollarını açıq-aşkar bəyan edir ki, müsəlmanlar heç zaman aldadılmasın və islama haradan gəldiklərini bilsinlər.

Öz düşmənlərini tanımamaqları ucbatından dözümsüzlük göstərən və mətanətlərini itirən təbliğatçıları və nəticəsiz hərəkatları çox görmüşük, onlar barəsində çox eşitmişik.

**13. Səbatın möhkəmlənməsinə təsir edən əxlaqi dəyərlərin toplanması.**

Bu keyfiyyətlərin ən birincisi səbirdir. Bunu Peyğəmbər, ε, öz hədisində də bir daha vurğulamışdır: *«Səbrdən daha xeyirli və daha əhatəli hədiyyə heç kəsə nəsib olmayıb»*.[1] İlk sarsıntı zamanı və ya fəlakət baş verərkən möhkəm səbir göstərmək məhz bu əxlaqi keyfiyyətlərin bir qoludur. İnsan gözləmədiyi bir müsibət tərəfindən yaxalandığı zaman ona qarşı səbirsizlik göstərmiş olsa, ruh düşkünlüyünə məruz qalar və mətanətini itirmiş olar.

Bu barədə mərhum İbn Cövzinin dediklərinə nəzər salaq: «Təqribən səksən yaşlı kişini gördüm. Camaatdan ayrılmazdı. Günlərin birində nəvəsi [qızının oğlu] vəfat etdi. Kişi dedi: "Heç kəs Allahı çağıraraq ağlamasın, çünki O, dualara cavab verən deyil". Sonra dedi: "Həqiqətən, Allah-taala inad edir və övladlarımızı bizə çox görür"».

Ühüd döyüşündə müsəlmanları müsibət yaxaladığı zaman bu onlar üçün çox gözlənilməz olmuşdu, çünki Allah-taala onlara qələbə vəd etmişdi. Lakin onlara qanlarının və canlarının bahasına başa gələn ağır bir dərs verdi. Bu barədə Allah-taala Quranda buyurur: **«Siz [Bədr müharibəsində yetmiş nəfəri öldürüb, yetmiş nəfəri əsir alaraq] onları**

---

[1] Hədisi Buxari və Müslim rəvayət etmişdir.

**ikiqat müsibətə düçar etdiyiniz halda, [Ühüd müharibəsində] başınıza bir müsibət gəldiyi zaman: "Bu haradan gəldi?" – dediniz. [Ya Məhəmməd!] "Söylə: "Bu sizin özünüzdəndir". Həqiqətən, Allah hər şeyə qadirdir».** [Ali-İmran, 165]. Bəs onlar hansı yanlış bir addım atmışdılar ki, Allah-taala da onlara bu cür ağır dərs vermişdi?

Döyüşdə ruhdan düşmüş və mübahisə aparmışdılar. Dünya malını vurulanlar sevdikləri şeyi gördükdən sonra əmrə asi olmuşlar.

**14. Saleh insanın nəsihəti.**

Müsəlman fitnələrə məruz qalarkən və günahlarının kəffarəsi olaraq Rəbbi tərəfindən imtahana çəkilərkən ona nəsihət edəcək və dəstək olacaq saleh bir insanın Allah-taala tərəfindən onun üçün təyin olunması səbatın amillərindən biridir. Saleh insanın verəcəyi nəsihət Allaha xoş gedər və bununla da Allah onun xətalarını düzəldər. Belə nəsihət Allahı, Onunla qarşılaşmanı və Onun Cənnət və Cəhənnəmini xatırladan zikrlərlə dolu olmalıdır.

Əziz qardaşım! İstərdim ki, saf qızıl əldə etmək üçün özünü fəlakətin içinə atan İmam Əhmədin həyatda başına gələn bəzi hadisələrlə yaxından tanış olasan. Əhvalatın qısa xülasəsi:

Onu qandallayıb xəlifə əl-Məmunun hüzuruna apardılar. Hələ xəlifənin yanına çatmamış ona hədə-qorxu gəlirdilər. Xəlifənin qulluqçularından biri İmam Əhmədə dedi: «Ey Əbu Abdullah, bunu demək mənim üçün çox ağırdır, lakin bil ki, xəlifə Məmun elə bir qılınc çəkib ki, bundan əvvəl heç belə qılınc çəkməmişdi və Allahın elçisi ilə olan qohumluğuna and içib ki, əgər sən Quranın məxluq olmasını qəbul etməsən, bu qılıncla mütləq səni öldürəcək»[1].

Belə bir məqamda aqil insanlar Quranın məxluq olmasını inkar etməklə öz imamları ilə görüşmək fürsətini əldə edə bilmişdilər.

---

[1] "əl-Bidəyətu və ən-Nihəyətu" 1/332.

Əz-Zəhəbinin «əs-Siyər» adlı kitabında Əbu Cəfər əl-Ənbaridən belə deməsi rəvayət olunur: «İmam Əhməd Xəlifə əl-Məmunun hüzuruna gətirildikdə dərhal bundan xəbər tutdum və Fərat çayını keçib ora gəldim. İmam Əhməd karvansarada oturmuşdu, salam verdim».

Dedi: «Ey Əbu Cəfər niyə zəhmət çəkib gəldin!»

Dedim: «Bu nə sözdür! Sən bu gün imamsan və insanlar sənin ardınca gedir. And olsun Allaha ki, əgər sən Quranın məxluq olmasını qəbul etsən, xalq da bunu qəbul edəcək. Yox, əgər bunu inkar etsən, çox insan həbs olunacaq. Buna baxmayaraq, əgər xəlifə səni öldürməli olsa, bil ki, onsuz da sən gec-tez öləcəksən və ölüm qaçılmazdır. Allahdan qorx, bunu qəbul etmə!»

Bu sözləri eşidən İmam Əhməd ağlamağa başladı və dedi: «Maşallah». Sonra əlavə etdi: «Ey Əbu Cəfər, bir daha!»

Mən təkrar etdikcə o: «Maşallah» – deyirdi.

İmam Əhməd xəlifə Məmunun hüzuruna aparılarkən yolda başına gələnləri belə xatırladı: «Düzənliyə çatdıq, gecədən xeyli keçmiş oradan yola düşdük. Yolda bizə bir kişi rast gəldi və dedi: «Əhməd ibn Hənbəl hansınızdır?»

Dedilər: «Budur».

Kişi sarbana dedi: «Bir az ayaq saxla». Sonra üzünü İmam Əhmədə tutaraq: «Səni Allaha tapşırıram» – deyib getdi.

İmam Əhməd dedi: «Onun barəsində soraqlaşdım, dedilər ki, Rəbiə qəbiləsindən olan ərəbdir. Səhralıqda yun paltar tikir. Adı Cabir ibn Abdullahdır. Xeyirxah adamdır».

İbn Kəsirin "əl-Bidəyətu və ən-Nihəyətu" adlı kitabında deyilir ki, bədəvi İmam Əhmədə dedi: «Sən insanların nümayəndəsisən, onlara qarşı bədbin olma. Bu gün sən onların imamısan, bax, Quranın məxluq olduğunu qəbul etmə ki, onlar da bunu etməsinlər və Qiyamət günü onların günahlarının daşıyıcısı olmayasan. Düşdüyün fitnələrə səbir et. Çünki səninlə Cənnət arasında ölümün dayanır».

İmam Əhmədin bədəvinin sözlərinə münasibəti belə olmuşdur: «Onun nəsihəti mənim Qurani-Kərimin məxluq olmasını qəbul etməyə təhrik edənləri bu işdən vaz keçmələri

üçün etdiyim əməlimdəki əzmimi və qətiyyətimi daha da gücləndirdi».[1] Digər bir rəvayətə görə isə İmam Əhməd belə demişdir: «Başıma bu iş gələndən bəri Touqda[2] düzənlikdə bədəvinin mənə dedikləri bu sözlərdən daha təsirli söz eşitməmişdim. Dedi: "Əgər sən Qurani-Kərimin məxluq olmasını inkar etdiyinə görə öldürülsən, şəhid olarsan. Yox, əgər sağ qalsan, Allaha həmd-səna edərək ömrünü başa vurmuş olarsan...". Bu sözlərdən sonra ürəyimin səbatı daha da möhkəmləndi».[3]

İmam Əhməd fitnələrə onunla birgə qatlanan Məhəmməd ibn Nuh adlı gənclə olan yoldaşlığını belə xatırlayır: «Məhəmməd ibn Nuh kimi, bilikli, Allahın əmrindən üz çevirməyən ikinci bir bir cavan görmədim. Allahdan ona yaxşı ölüm diləyirəm.

Həmin gün mənə dedi: "Ey Əbu Abdullah, sən ki mənim kimi deyilsən, sən insanlar üçün bir nümunəsən. Allahdan qorx və Onun əmrinə tabe ol". Sonunda həmin gənc dünyasını dəyişdi. Cənazə namazını qıldım və dəfn etdim».[4]

Namazlara əli-qolu bağlı vəziyyətdə rəhbərlik edən İmam Əhmədlə bərabər türmədəki insanlar öz sözlərinin üstündə durmağı və mətanətli olmağı bacardılar.

Bir dəfə İmam Əhməd həbsdə olarkən belə demişdir: «Türmənin mənim üçün bir o qədər də fərqi yoxdur. O mənə öz evim kimidir. Mən qılıncla öldürülməkdən də qorxmuram, mən ancaq şallaq əzabından qorxuram». Onun bu sözünü türmədəki bəzi adamlar eşidib ona belə demişdilər: «Ey Əbu Abdullah, narahat olma! Çətini iki şallaqdır. Ondan sonra vurulan şallaqların hara dəydiyini belə, hiss etmirsən». Bu sözlər sanki ona təsəlli oldu.

---

[1] "əl-Bidəyətu və ən-Nihəyətu" 1/332.
[2] Fərat çayının sahilində Bağdad və Riqqə arasında kiçik şəhər.
[3] "Siyəru ə'ləm ən-nubələi" 11/241.
[4] "Siyəru ə'ləm ən-nubələi" 11/242.

Əziz qardaş! Saleh insanlardan sənə öyüd-nəsihət verməlорini tələb et. Nəsihətlər verildikdə isə onlardan məqsədəuyğun olanını və daha ağıllısını yerinə yetir.

Səfərə çıxmamışdan qabaq orada başına gələcəyindən qorxduğun hadisə barədə nəsihət istə!

Bəlalara və müsibətlərə düçar olduqda nəsihət istə!

Hər hansı bir vəzifəyə təyin olunduqda, yaxud mal-dövlət və zənginlik varisi olduqda nəsihət istə! Bu yolda özünü və qeyrilərini sabitqədəm et və bil ki, Allah-taala möminlərin dostudur.

**15. Cənnətin ləzzəti, Cəhənnəmin əzabı barədə düşünmək və ölümü yada salmaq.**

Cənnət şadlıqlar diyarı, qəm-qüssələr təsəllisi və köçəri möminlərin son dayanacağıdır. Burada can heç zaman ölümü dadmayacaq bir xilqətdə yaradılmışdır. Bu diyarın sakini olmaq üçün çalışan və səbat göstərən insan üçün bütün çətinliklər yüngülləşdirilir. O, qarşısında olan bütün məşəqqət və əngəlləri dəf edir. Ona bəxş ediləcək mükafatın nə olduğunu bildikdə qarşısında duran işin çətinliyinin fərqinə belə varmır. O öz yoluna davam edir və bilir ki, əgər bu yolda sabitqədəm olmasa, eni göylərə və yerə bərabər olan Cənnəti əldən buraxmış olar. Həqiqətən, can onu palçıqdan yüksəldən və səmalarda olan aləmə ucaldan qüvvəyə son dərəcə möhtacdır.

Peyğəmbər, (sav), öz səhabələrinin səbatlı olmaları üçün tez-tez Cənnəti yada salardı. Yaxşı və səhih isnadlı bir hədisdə deyilir ki, bir dəfə Allahın elçisi Allah yolunda əziyyət və məşəqqətlərə qatlanan Yasirin, Əmmarın və Ümm Əmmarın yanından keçərkən onlara belə dedi: *«Səbir et, ey Yasir ailəsi! Səbir et, ey Yasir ailəsi! Həqiqətən, sizə Cənnət vəd olunmuşdur».*[1]

---

[1] Hədisi Hakim rəvayət etmişdir.

Həmçinin Peyğəmbər, (sav), ənsarlara belə deyərdi: *«Məndən sonra xudbinliklə qarşılaşacaqsınız. Mənimlə hovuzda görüşənədək səbir edin».*[2]

Yaxşı olardı ki, qəbir, məhşər, tərəzi, sırat (qıl körpüsü) və digər axirət mənzillərindəki iki fərqli hal barəsində yaxşı-yaxşı düşünəsiniz.

Həmçinin ölümün yada salınması müsəlmanı pis yola düşməkdən qoruyur, onun Allahın təyin etdiyi çərçivədən qırağa çıxmamasını və həddini aşmamasını təmin edir. Əgər o bilsə ki, ölüm ona ayaqqabısının qaytanından da yaxındır və ölüm hər an onu yaxalaya bilər, onda necə olur ki, o haqq yolundan yayınmaq, yaxud da batil əqidəsini uzun müddət davam etdirmək kimi pis fikrə düşür. Bunun üçün də Peyğəmbər, ε, belə deyərdi: *«Ləzzətlərin sonu olacaq ölümü tez-tez xatırlayın».*[3]

## SƏBATIN MƏQAMLARI

Səbatın məqamları çoxdur və bu məqamların izaha ehtiyacı vardır. Gəlin onlardan bəzilərinin icmalını verməklə kifayətlənək.

**1. Fitnələr baş verərkən səbatlı olmaq.**

Ürəklərin düçar olduğu dəyişkənliklər və səbatsızlıq fitnələrdən irəli gəlir. Əgər ürək şadlıq və fəlakət gətirən fitnələrə məruz qalsa, ancaq imanı qəlblərinə yerləşdirən göz və ağıl sahibləri bu fitnələr qarşısında səbatlı və dözümlü olacaq. Gəlin fitnələrin aşağıdakı bəzi növlərinə nəzər salaq.

**Mal-dövlət fitnəsi.**

Allah-taala Quranda fitnənin bu növünə düçar olanları belə vəsf edir: **«[Münafiqlərin] bəzisi də Allahla belə əhd etmişdi: “Əgər Allah bizə Öz nemətindən [mal-dövlət] bəxş etsə, biz mütləq sədəqə [həmin malın zəkatını] verəcək və,**

---

[2] Hədisi Buxari və Müslim rəvayət etmişdir.
[3] Hədisi Tirmizi rəvayət etmişdir.

**sözsüz ki, əməlisalehlərdən olacağıq". [Allah] Öz nemətindən onlara [istədiklərini] ehsan buyurduqda xəsislik etdilər və [əhdə vəfa etməyib itaətdən də] üz döndərdilər. Onlar elə zatən dönükdürlər».** (ət-Tovbə, 75-76).

**Vəzifə və şan-şöhrət fitnəsi.**

Bu barədə Allah Öz müqəddəs kitabında buyurur: **«Səhər-axşam Rəbbinin rizasını diləyərək Ona ibadət edənlərlə birlikdə özünü səbrli apar [nəfsini qoru]. Fani dünyanın bər-bəzəyini arzu edib nəzərlərini onlardan [yoxsul möminlərdən] çevirmə. Qəlbini Bizi [Quranı] xatırlamaqdan qafil etdiyimiz, nəfsinin istəklərinə uyan və [hər] işində ifrata varan bir kimsəyə itaət etmə!».** (əl-Kəhf, 28).

Peyğəmbər, (sav), hədislərinin birində yuxarıda qeyd etdiyimiz fitnələrin təhlükəsi barədə belə deyir: *«İnsanın mal-dövlətə və şan-şöhrətə hərisliyinin dininə gətirdiyi fəsad sürüyə hücum çəkən iki ac canavarın törətdiyi fəsada bənzər»*[1].

**Zövcənin fitnəsi.**

Bu barədə Allah-taala buyurur: **«Ey iman gətirənlər! Şübhəsiz ki, zövcələrinizdən və övladınızdan sizə düşmən olanlar vardır. Onlardan özünüzü gözləyin!».** (ət-Təğabun, 14).

**Övladın fitnəsi.**

Peyğəmbər, (sav), hədislərinin birində övladı belə vəsf etmişdir: *«Övlad valideyni xəsisliyə, cəsarətsizliyə sövq edər və ona dərd gətirər»*[2].

**Zorakılığın, istibdadın və zülmün törətdiyi fitnələr.**

Bu barədə ən gözəl misalı uca və böyük Allah Qurani-Kərimdə göstərir: **«[Nəcranda İsaya iman gətirmiş kimsələri yandırıb külə döndərən] xəndək sahibləri [lənətə düçar**

---

[1] Hədisi Əhməd rəvayət etmişdir.
[2] Hədisi Əbu Yəla rəvayət etmişdir.

**olub] qətl edildilər. O xəndəklər ki, çırpı ilə alovlandırılmışdı. O zaman onlar [xəndəklərin] kənarında oturub, [öz əsgərlərinin] möminlərin başlarına gətirdikləri [müsibətlərə] tamaşa edirdilər. Onlardan [möminlərdən] yalnız yenilməz qüvvət sahibi, [hər cür] şükrə, [tərifə] layiq olan Allaha iman gətirdiklərinə görə intiqam alırdılar. O Allah ki? göylərin və yerin ixtiyarı Onun əlindədir. Allah hər şeyə şahiddir!»** (əl-Buruc, 4-9).

Xəbbabın belə deməsi rəvayət olunur: «Allah elçisinin hüzuruna şikayətə gələrkən o, Kəbənin kölgəsində burdəsini [əbasını] yastıq kimi başının altına qoymuşdu. Dedik: "Ey Allahın elçisi! Bəs bizim üçün yardım diləmirsənmi, bizim üçün dua etmirsənmi?" Peyğəmbər, ε, dedi: *"Vaxt var idi ki, adamı tutub aparar, onun üçün quyu qazar və onu quyuya salardılar. Sonra mişar gətirib adamın başını iki hissəyə bölər, ətsiz və sümüksüz başı dəmir daraqla darayardılar. Lakin bütün bu əzablar belə, onun dinindən dönməsinə heç bir təsir göstərə bilməzdi. And olsun Allaha ki, bu günlər də gəlib keçəcək və elə bir vaxt gələcək ki, Səna ilə Həzrəmövt arasında gəzib dolaşan [sürüsünü otaran çoban] nə Allahdan başqa bir kimsədən, nə də sürüsünə hücum çəkən canavardan qorxacaq. Lakin siz səbirsizlik göstərirsiniz".»*[1].

**Dəccalın fitnəsi.**

Bu həyatda baş verəcək fitnələrin ən böyüyü və ən dəhşətlisidir. Peyğəmbər, (sav), bu dəhşətli fitnəni öz səhabələrinə belə vəsf etmişdir: *«Ey insanlar! Həqiqətən, Allah-taala Adəmi, υ, yaradandan bəri yer üzündə Dəccalın fitnəsi kimi dəhşətli və böyük bir fitnə olmamışdır. Ey Allahın qulları! Ey insanlar! Möhkəm olun! Mən onu sizə elə vəsf edəcəyəm ki, məndən öncəki heç bir peyğəmbər onu bu şəkildə vəsf etməmişdir»*[2].

---

[1] Hədisi Buxari rəvayət etmişdir.
[2] Hədisi İbn Macə rəvayət etmişdir.

Fitnələr qarşısında ürəklərin möhkəm olmasının və fitnələri rədd edilməsinin mərhələləri haqqında Peyğəmbər, ε, belə buyurur: *«Həsirlər yeri döşədiyi kimi fitnələr də ürəkləri bürüyər. Hansı ürək fitnəyə uysa, o ürəkdə qara bir ləkə yaranar. Fitnələrə tab gətirən, onları rədd edən ürəkdə isə ağ ləkə əmələ gələr. Bununla da ürəklər iki qismə ayrılar. Ağ ləkəli ürək hamar daşa bənzər. Göylər və yer durduqca fitnənin ona heç bir zərəri toxuna bilməz. Qara ləkəli ürək isə səhəng kimi boz və əyri olar. Nə halalı halal, nə də haramı haram bilər, ancaq öz nəfsinin qulu olar»*[3].

**2. Cihadda möhkəm və səbatlı olmaq.**

Allah-taala buyurur: **«Ey iman gətirənlər! Bir dəstə [kafir dəstəsi] ilə üz-üzə gəldikdə möhkəm olun və Allahı çox yada salın ki, bəlkə, nicat tapasınız!»** (əl-Ənfal, 45).

Dinimizdə «əl-Kəbair» adlanan böyük günahlardan biri də ordudan [döyüşdən] yayınmaqdır. Hətta Peyğəmbər, ε, də Xəndək döyüşündə kürəyində torpaq daşıyar və möminlərlə birgə: *«…düşmənlə qarşılaşarkən dizimizə qüvvət ver…»*[4] – deyərdi.

**3. Doğru yolda səbatlı və möhkəm olmaq.**

Bu yolun səbatlı yolçuları barədə Allah-taala Quranda belə deyir: **«Möminlər içərisində elələri də vardır ki, Allahla etdikləri əhdə sadiq olarlar. Onlardan kimisi [bu yolda] şəhid olmuş, kimisi də [şəhid olmasını] gözləyir. Onlar [verdikləri sözü] əsla dəyişməzlər».** (əl-Əhzab, 23). Ayədən də göründüyü kimi belə möminlər öz prinsiplərinə canlarından və həyatlarından daha çox önəm verir, bu yolda nəinki geri dönmək əksinə, prinsiplərinin həyata keçirilməsi üçün qəti israr göstərirlər.

**Ölüm ayağında belə, Allahın dininə sədaqət göstərmək.**

---

[3] Hədisi Əhməd rəvayət etmişdir.
[4] Hədisi Buxari rəvayət etmişdir.

Küfr edənlərə və günahkarlara gəlincə, onlar ən ağır və kədərli anlarda dözümlü olmaqdan məhrum olmuşlar. Belə ki, onlar ölüm ayağında belə kəlmeyi-şəhadəti dillərinə gətirə bilmirlər. Şübhəsiz ki, bu cür vəziyyətdə həyatla vidalaşmaq pis ölümün əlamətlərindəndir. Buna misal olaraq canını tapşırdığı zaman ona: «Lə iləhə illəllah» – deməsi söylənilərkən başını sağa-sola tərpədərək bunu etməyəcəyini bildirən bir kişinin ölümünü yada salaq. Yaxud başqa birisi can verərkən: «Bu yaxşı hissədir, bunun qiyməti daha ucuzdur» – deyir, digəri ölüm ayağında olarkən şahmat fiqurlarının adlarını çəkir, başqa birisi həyatının son anlarında musiqi nəğmələrini mızıldayır, birisi məşuqunu yada salır. Çünki bütün bu boş və faydasız məşğuliyyətlər onları bu dünyada Allahı yada salmaqdan yayındırmışdır.

Bu cür insanlarda ruh bədəndən çıxarkən sifətlərinin qaraldığını, xoşagəlməz iy verməlerini, yaxud da Qiblədən üz çevirmələrini müşahidə etmək olar.

Lakin əməlisalehlərə gəldikdə, şübhəsiz ki, Allah-taala onlara can verərkən səbatlı olmağı və kəlimeyi-şəhadəti tələffüz etməyi müvəffəq etmişdir. Fasiqlərdən fərqli olaraq bu insanlarda ruh bədəndən çıxarkən üzlərində sevinc, fərəh hisslərini, cəsədlərindən xoş iyin gəlməsini duymaq olar.

Mövzu ilə əlaqədar həyatının son dəqiqələrində səbatlı olmağa müvəffəq olan məşhur hədis alimlərindən biri Əbu Zər ər-Razinin hekayətini qeyd etmək lap yerinə düşərdi.

Hekayənin məğzi:

Əbu Züranın dəftərxanaçısı olan Əbu Cəfər Məhəmməd ibn Əli demişdir: «Əbu Züra həyatının son anlarını yaşayarkən biz onu Reydə ziyarət etdik. Əbu Hatim, İbn Varih, Munzir ibn Şazan və başqaları yanında toplaşmışdılar. Təlqin hədisini – *«Ölüm ayağında olan kəslərə "Lə iləhə illəllah" kəlməsini təlqin edin»* yada salıblar. Lakin bunu Əbu Züraya təlqin etməkdən utandılar və hədisi onun yadına salmağı təklif etdilər. İbn Varih ravilərin adını saymağa başladı, lakin onları tam sadalamadı. Əbu Hatim də sadaladı, lakin o da bunu axıra çatdırmadı. Yanında olan digər tələbələri isə susurdular. Bunu görən Əbu

Züra son dəqiqələrində gözlərini açdı və: «Bunlar, Əbu Asim və Əbdülhəmid Saleh ibn Əbu Əribdən, o da Kəsir ibn Murradan, o da Müaz ibn Cəbəldən eşidərək rəvayət etmişlər ki, Allahın elçisi buyurmuşdur: *«Kimin son sözü "Lə iləhə illəllah" olsa, Cənnətə daxil olacaq»* – deyərək ruhu bədənindən çıxdı».[1] Allah ona rəhmət eləsin!

Bu cür sonluqla canlarını tapşıran insanlar barəsində Allah-taala Qurani-Kərimdə belə buyurur: **«Şübhəsiz: "Rəbbimiz Allahdır!" – deyən, sonra da [sözündə] düz olan kəslərə [ölüm ayağında] mələklər nazil olub [belə deyəcəklər]: "Qorxmayın və kədərlənməyin! Sizə vəd olunan Cənnətlə sevinin!"».** (Fussilət, 30).

Nəhayət, Allahdan arzum budur ki, Allah-taala bizi də o kəslərdən etsin, işlərimizdə və niyyətimizdə rəşadətli olmağımız üçün bizə dözüm və iradə bəxş etsin! Gəlin sonda bir daha aləmlərin Rəbbi olan Allaha həmd-sənalar edək və Onun şəninə təriflər oxuyaq!

***Məhəmməd Saleh əl-Münəccid***

---

[1] "Siyəru ə'ləm ən-nubələi" 13/75-76.